# LAYİQLİ NƏSLİN LAYİQLİ ÖVLADI



Akademik Niyazi Səmədovun yeganə övladı və layiqli davamçısı b.e.n. Arif Səmədov 13 sentyabr 2014-cü ildə, ömrünün 68-ci ilində ağır xəstəlikdən sonra qəflətən vəfat etmişdir.

Arif Niyazi oğlu Səmədov 1946-cı ildə Bakı şəhərində anadan olmuşdur. O, 1969-cu ildə V.İ.Lenin adına Azərbaycan Dövlət Pedaqoji İnstitutunun (indiki N.Tusi adına Azərbaycan Dövlət Pedaqoji Universiteti) kimya-biologiya fakultəsini bitirmişdir. 1970-ci ildə Moskva şəhərində SSRİ Elmlər Akademiyasının A.N.Severtsov adına "Heyvanların Təkamül Morfologiyası və Ekologiyası" İnstitutunun əyani aspiranturasına daxil olmuş və "Onurğasız heyvanların eko-fizioloji proseslərinin bioloji ritmi" mövzusunda dissertasiya müdafiə edərək, biologiya elmləri namizədi elmi dərəcəsi almışdır. 1973-cü ildən başlayaraq Arif Səmədov Azərbaycan Elmlər Akademiyası sistemində əvvəlcə Zoologiya İnstitutunda, sonra Botanika İnstitutunda, 2003-cü ildən başlayaraq həyatının son günlərinə qədər AMEA Radiasiya Problemləri İnstitutunda fəlaiyyət göstərmişdir.

Arif Səmədovun əsas elmi işləri ibtidai heyvanların ekoloji fiziologiyası, biokimyəvi proseslərin ritmikası, bitkilərdə bakteriozların immunodiaqnostikası metodlarının işlənib hazırlanmasına həsr olunmuşdur. A.N.Səmədov həmçinin Abşeron yarımadasının radionukliddlərlə çirklənmiş torpaqlarının monitorinqi və radioekoloji xəritəsinin hazırlanmasında yaxından iştirak etmişdir.

A.N.Səmədov 35-dən yuxarı elmi əsərin və bir müəlliflik şəhadətnaməsinin müəllifidir.

30 ilə yaxın bir müddətdə Arif Səmədov AMEA-nın "Xəbərləri" jurnalının Biologiya elmləri seriyasının məsul katibi kimi fəaliyyət göstərmişdir. Bu iş onun yüksək insani keyfiyyətlərini və elmi qabiliyyətini bir daha nümayiş etdirmişdir. Jurnalın elmi səviyyəsinin və poliqrafik keyfiyyətinin beynəlxalq standartlara uyğun şəkildə qaldırılmasında Arif müəllimin əməyi böyük olmuşdur.

AMEA-nın "Xəbərləri" jurnalının Biologiya və Tibb elmləri bölməsinin redaksiya heyəti təvazökar insan və tanınmış alim Arif Səmədovun vaxtsız vəfatından kədərləndiklərini bildirir və məhrumun ailəsinə dərin hüznlə başsağlığı verirlər. Arif Səmədovun xatirəsi onun tanıyanların qəlbində olan yaşayacaqdır. Allah rəhmət eləsin.

***"AMEA-nın Xəbərləri" jurnalının Biologiya və Tibb elmləri seriyasınınn redaksiya heyəti***